

# Mübtədi və fasiqin arxasında namaz qılmağın hökmü

Şeyx Muhammәd әz-Zәmzәmi

# *MÜBTƏDİ VƏ FASİQİN ARXASINDA NAMAZ QILMAĞIN HÖKMÜ*

لا إله إلا الله

محمد رسول الله

Müəllif

**Şeyx Muhamməd əz-Zəmzəmi**

# مُقَدِّمَة

## Ön söz

Bütün həmd-sənalarımız Allaha aiddir! Yalnız Ona ibadət edir və yalnız Ondan kömək diləyirik. Şahidlik edirik ki, Allahdan başqa ibadətə layiq haqq məbud yoxdur, Təkdir və şəriki yoxdur və Muhamməd Onun qulu və elçisidir!

Allahım! İbrahimə və ailəsinə xeyir dua və bərəkət verdiyin kimi Muhamməde və onun ailəsinə də xeyir-dua və bərəkət ver!

Heç şübhəsiz ki, İslamın ən aşkar şüarı və ən güclü dayağı namazdır. Namazın dinimizdəki bu qədər əhəmiyyətli yeri olduğu üçün İslam alimləri əsrlər boyu namazın əhkamları haqqında geniş bəhslər və uzun yazılar ortaya qoyublar. Hər bir müsəlmanın bu ibadətdən cahil qalmaması üçün artıq əlimizdə hər cür rəhbər vasitələr mövcuddur. Məlumdur ki, mübarək şəriətimiz beş vaxt namazları camaat ilə birlikdə qılmağı bizə əmr etmişdir. Bu beş vaxt namazın hər hansı bir imamın arxasında qılınacağı da heç kəsdən gizli deyildir. Bəs müsəlmanlara bu beş vaxt namazda hər kəs imamlıq edə bilərmi? Sözsüz ki, namazda imamlıq məqamı şərəfi böyük, şanı uca bir məqamdır. Lakin günümüzdəki müsəlman camaatı sanki bu məqamın dəyərindən qafildirlər və onlara kimin imamlıq edəcəyinə diqqət etməzlər. Güman edirik ki, təqdim edəcəyimiz bu kiçik risalə bu yöndə müsəlmanlar üçün faydalı olacaq.

Onu da qeyd etməliyik ki, bu risaləni yazmaqla məqsədimiz hansı görüşün doğru olduğunu isbat etmək deyildir. Həqiqətdə bu barədə deyilmiş görüşlərin hamısının tutarlı əsasları və dəlilləri vardır. Lakin bu risaləni tərcümə edərək müsəlmanlara

düşdükləri xətanın təhlükəsini hiss etdirmək istəyirik. Bizi həm də havalarına tabe olan bəzi qrupların yalnış anlayışları və əyri niyyətləri narahat edir, onlar bu cür məsələləri şişirdərək öz istəkləri ilə bidətçi saydıqları kimsələrin arxasında namaz qılmağı tərk etməyə çağırırlar. Bəziləri namazı tərk edəni kafir saymayanları bidətçi adlandırır, digərləri əməlləri kamilliyin şərti görənləri mübtədi adlandırır, bir başqaları təvəssülü caiz sayanları mübtədi və zəlalət əhli adlandırır. Biz hər hansı bir məsələdə mövqe sahibi olsaq da, bəzi məsələlərin alimlər arasında müzakirə və ixtilaf obyekti olduğunu da nəzərə alırıq. Etiraf edirik ki, namazı tərk edəni kafir saymayanların ümmətin böyük əksəriyyətidir. Etiraf edirik ki, hər hansı bir vəch ilə əməlləri imandan ayırmaq, onların arasında fərq qoymaq bizim görüşümüzdə bidət olsa belə böyük hənəfi alimləri, zahirilər, Əbu İshaq əş-Şirazi, İbn Hacər əl-Asqalani, İbn Abdil-Bərr və bəzi digər məzhəb imamları əməlləri tamamilə tərk edənləri müsəlman sayıblar. Etiraf edirik ki, ümmətin böyük əksəriyyəti peyğəmbərin – salləllahu aleyhi va səlləm – haqqı ilə təvəssül etməyi caiz görüb. Bu cür misalları artırmaq mümkündür, lakin bu müqəddimə bunun üçün bir yer deyildir. Bununla sadəcə qəsdimizi daha aydın izah etməyi istədik və müsəlmanları bu incəliklərə fikir verməyə dəvət edirik.

Lakin aramızda aşkar fasiqlik edən, fitnə yayan və aşkar bidətlərə dəvət edənlər olduğu üçün onları namazda imam olaraq önə keçirməkdə diqqətli olmaq lazımdır. Bu cür kimsələri İslamın ən şərəfli məqamlarından birinə gətirmək namaza qarşı hörmətsizlikdir.

Samir Firdovsioğlu

## Müəllif haqqında

**Alləmə əş-Şərif Muhamməd əz-Zəmzəmi bin Muhamməd bin əs-Siddiq əl-Ğumari** əşari və sufi ailəsində doğulmuşdur. Ailəsi "siddiqiyyə" təriqəti üzərində olan bir təsəvvuf əhli olaraq məşhurdur. Hicri 1330–cu ildə valideynləri həccə gedərkən Misirdə, Bur-Said'də anadan olmuşdur. Quranı şeyxi, fiqh alimi Muhamməd əl-Əndəlusi'dən öyrənir, hicri 1349-cu ildə böyük qardaşı Əhmədin yanında elm öyrənməyə başlamışdır. Qardaşı Abdullah ilə birlikdə "əl-Acurrumiyyə" kitabını və "Əlfiyyə İbn Malik" kitabının bir hissəsini oxuyurlar. Eləcədə İmamul-Harameyn'in "əl-Varaqat" kitabını, "Cəmul-Cavami aləl-Bəxira" kitabının əvvəlini öyrənirlər. Sonra qardaşı ilə Qahirəyə səfər edir və orada Əzhar universitetinə daxil olur. Orada Abdus-Sələm Ğuneym, Əbu Talib Həsəneyn, Mahmud əl-İmam, Abdul-Məcid əş-Şərqavi, Şeyx Muhamməd Buxeyt əl-Matii və digərləri yanında dərs almışdır.

Hicri 1354-cü ildə atası öldükdə Tanca şəhərinə geri dönmüşdür. Böyük məsciddə könüllü dərslər verməyə başladı. Sufilik təriqətinə dəvət etmiş və bu təriqəti həmişə dəstəkləmişdir, hətta bu barədə "əl-İntisar li Tariqatis-Sufiyyətil-Əxyar" kitabını yazmışdır.

Sonra qırx yaşlarına çatdıqda sufiliyi tərk etmiş və hədis əhlinin yoluna dönmüşdür. Sufi təriqətlərini rədd etmiş və onlardan bəzi qollarını təkfir etmişdir. Onlardan və öz atası və qardaşlarından uzaq olduğunu bəyan edərək bu barədə "əz-Zəviyə va mə fihə minəl-Bidə val-Əaməl əl-Munkəra" adlı kitabını yazmışdır. Sufilərin əyriliklərini və batillərini ifşa etdiyi üçün qardaşları və digər yaxınları ilə düşmən oldu. Lakin heç zaman bu yolundan dönmədi. Məzhəb təəssübkeşliyinə qarşı həddindən artıq şiddətli olmuş və səhih sünnətə bağlı olmağa çağırmışdır.

Hicri 1408-ci ildə xəstələnərək yatağa düşmüş, bir müddət yataqda qaldıqdan sonra Rəbbinə qovuşdu. Allah rəhmət etsin!

**Allaha həmd olsun, Allahın Elçisinə, ailəsinə, səhabələrinə və onlara xeyirdə tabe olanlara salat və salam olsun!**

Şübhəsiz ki, namazda imamlıq şərəfli bir məqamdır və əzəmətli bir əməldir və bu məqama layiq olmayan sifətlərdən təmiz olan birindən başqasını belə bir məqam üçün önə keçirmək doğru deyildir.

Bu zamanımızın insanlarının İslamdan cahil olmaqlarının və İslamın haramlarında etinasız davranmalarının əlamətlərindən biri də budur ki, namazda imamlıq üçün ona uyğun olmayan, belə bir məqama layiq olmayan kimsələri önə keçirirlər.

Əgər təhqiq əhlindən olan alimlər bu əməllərini inkar etsə onlara tənə edir və onları yalan və böhtanda ittiham edirlər, çünki İslamdan cahildirlər, İslamın şərəfli məqamlarına göstəriləcək ehtiramdan uzaqdırlar.

Səhabələr Əbu Bəkrin – *radiyallahu anhu* - ən fəzilətli olmasına və onun xəlifəliyə layiq olmasına dəlil olaraq onun namazda imam durmasını göstəriblər, çünki peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – onu xəstəliyi zamanında imam olaraq önə keçirməsindən anlamışdılar ki, xəlifəlik üçün ən uyğunu və ən layiqli olan Əbu Bəkrdir.

Bunun mənası budur ki, səhabələrə görə namazda imamlıq dinin ən şərəfli məqamı idi, bu məqama insanların ən fəzilətlisi, səviyyə etibarı ilə ən yüksəyi keçirilə bilərdi. Lakin cahillər bu məsələdən qafildirlər və cahillikləri ilə etiraz edirlər.



## FƏSL

İmam Malikin və bir qrup imamın məzhəbinə görə mübtədinin və aşkarda fasiqlik edən birinin imamlığı səhih deyildir.[1]

Xalil "əl-Muxtəsar" əsərində deyir: "**Həruri[2] və qədəri kimi bidətçi bir imamın arxasında namaz qılıbsa, namazın vaxtı çıxmadan əvvəl namazını təkrarlamalıdır.**" Sitatın sonu; əd-Dərdir'in şərhi ilə birlikdə

Sözünün mənası budur ki, kim mübtədi bir imamın arxasında namaz qılarsa, namazını təkrarlaması ona vacibdir.

əd-Dəsuqi "haşiyəsində" deyir: "**Mötəməd görüş budur ki, mübtədinin arxasında namaz qılmaq qadağandır, əgər arxasında namaz qılarsa namazını təkrarlamalıdır.**"

Miyara "əş-Şərhul-Kəbir aləl-Murşidil-Muin" kitabında deyir: "**İmamlığın şərtlərindən biri də onun fasiq olmamasıdır; bura alkohol içmək, zina, oğurluq və buna bənzər aşkar fasiqlik və qədəri, cəbri kimi etiqaddakı fasiqlik aiddir. əl-Qabbəb ded: "Ən adil məzhəb budur ki, fasiq biri nə şəfaət üçün, nə də imamlıq üçün önə keçirilməz və kim arxasında namaz qılarsa namazı təkrarlamaq lazım deyildir.**"

---

[1] Qeyd etməliyik ki, bidətinə dəvət edən mübtədi və aşkarda fisq edən fasiqin arxasında namaz qılmaq alimlərin icması ilə məkruhdur. Bu barədə Şeyxul-İslam İbn Teymiyyə - rahiməhullah – deyir: "Fasiq birinin arxasında namaz qılmağın məkruh olması barədə imamlar ittifaq ediblər. Lakin belə bir namazın səhih olub olmamasında ixtilaf ediblər. Bunun səhih olmadığı deyilib və bu görüş Malik və Əhməddən gələn iki rəvayətdən biridir. Bu namazın səhih olduğu da deyilib və bu, Əbu Hənifə və əş-Şafi'nin görüşüdür. Bu ikisindən nəql edilmiş başqa bir rəvayətə görə "belə birinin imam təyin edilməsinin doğru olmadığında heç kəs ixtilaf etməmişdir." ["Məcmu əl-Fətava", 23/358]

[2] Hərurilər Həzrəti Əlinin – kərraməllahu vachəhu – zamanında ortaya çıxan xavaric firqəsinin adı idi. Kufənin Hərura ərazisindən çıxdıqları üçün onlara bu ad verilib.

Sözünü davam edərək daha sonra deyir:

“**Lakin etiqadda fasiq olana gəldikdə isə, Əsbəğ və Abdul-Həkim dedi: “Kim arxasında namaz qılarsa hər bir zaman namazını təkrarlaması lazımdır.”**[3] **İbnul-Qasim'in “əl-Mudəvvanə”dəki sözü belədir: “Namazın öz vaxtı içində təkrarlamalıdır.” İbn Həbib isə deyir: “İmam vəli və polis işçiləri olmadığı təqdirdə hər bir zaman təkrarlaması lazımdır, (vəli və polis işçisi olan mübtədinin) arxasında namaz isə caizdir. Əgər namazı öz vaxtı içində təkrarlayarsa daha gözəl olar.” İbn Hacib dedi: “Orada – yəni əl-Mudəvvanə kitabında – deyir: “Onlarla evlənilməz, arxalarında namaz qılınmaz və salam verilməz.**” Adını qeyd etdiyimiz şərhdən gətirdiyimiz sitat burada qurtarır.

Xalil “əl-Muxtəsar”da deyir: “**Zinakar, içki içən, valideynə asi olan və bənzəri kimsələr kimi adilliyini pozacaq şəkildə fasiqliyi aşkar olan birinin arxasında namaz qılan kəsin namazı batildir...**” əd-Dərdir'in şərhi ilə birlikdə sitat burada bitdi.[4]

Əbul-Qasim əl-Xiraqi “əl-Muxtəsar” əsərində deyir: “**Kim bidətini elan edən və ya içki içən birinin... arxasında namaz qılarsa, namazını təzələməlidir.**”

İbn Qudamə bunun şərhində deyir: “**əl-Əsrəm dedi: “Əhməd bin Hənbəl'dən soruşdum: “Rafizilər...?” Dedi: “Onların arxasında namaz qılanlara namazlarını təzələmələrini buyuraram.” Ondan soruşuldu: “Bidət əhlinin hamısı bu hökmdədir?” Dedi: “Xeyr, çünki onlardan elələri var ki, susurlar.**”

Yəni; bu rəvayətdə Əhmədə görə əgər mübtədi öz bidətini gizlədirsə onun arxasında namaz qılmaq caizdir.

Dedi: “**Ondan həmçinin rəvayət olunub ki, heç bir halda mübtədinin arxasında namaz qılınmaz.” Yəni bidətini gizlətməsi ilə üzə çıxarması arasında fərq yoxdur. Dedi: “Onlardan bir zərər gələcəyindən qorxulması halı istisnadır, bu zaman namazını qılar, sonra təzələyər.**”

Sonra dedi: “**əl-Əsrəm rəvayət edir ki, Vasilə ibn əl-Əsqa'dan ( səhabədir) bir qədəri arxasında namaz qılmaq barədə soruşdular . Dedi: “Onun arxasında namaz**

---

[3] “Hər bir zaman namazını təkrarlaması lazımdır” sözləri ilə qəsd olunan budur ki, əgər fasiq və mübtədi birinin arxasında namaz qılarsa, istər namazın vaxtı çıxmış olsun, istərsə çıxmamış olsun, həmin namazı təkrarlamaq lazımdır.

[4] Müəllif – rahiməhullah – buraya qədər böyük maliki alimlərinin görüşünü qeyd etdi. Bundan sonra isə əl-Xiraqi, İbn Qudamə kimi hənbəli alimlərinin görüşünü gətirir.

**qılınmaz.” Sonra dedi: “Əgər arxasında namaz qılsaydım mütləq namazımı təzələyərdim.**”

Qədəri bidət əhlidir, onlar Allahın qədərini inkar edirlər.

Cəbri də bidət əhlidir, onlar deyirlər ki, insan əməlinə məcbur edilir, heç bir ixtiyarı yoxdur.

Alimlərdən eləsi də var ki, mübtədinin və aşkar fasiqlik edənin imamlığının səhih olduğunu deyir.

Lakin onların görüşləri dəlil və sünnət baxımından zəifdir, çünki peyğəmbərin şərəfli hədisləri mübtədinin və aşkar fasiqlik edənin imamlığının səhih olmadığını göstərir.

Muslim Əbu Zər’dən – *radiyallahu anhu* - rəvayət edir ki, peyğəmbər – *salləllahu aleyhi va səlləm* – ona dedi: “**Əgər üzərində namazlarını sonraya təxirə salan əmirlər olsa nə edəcəksən?” Dedim: “Mənə nə buyurursan?” Dedi: “Namazı vaxtında qıl, əgər onlarla birlikdə namaza yetişsən qıl onlarla, sənin üçün nafilə olacaq.**”[5]

Hədisin mənası:

Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – Əbu Zər’ə namazı ixtiyarı vaxtından gecikdirən imamların arxasında namaz qılmağı qadağan etdi. Hədisdə sözü keçən əmirlər əməvi dövlətinin əmirləridir, çünki bu cür edənlər onlar idilər, necəki buna “əl-Muvatta” kitabındakı birinci hədis dəlalət edir: “**Urvə bin əz-Zubeyr, Ömər bin Abdul-Azizin əsr namazını gecikdirməsini inkar etdi.**” O zaman Ömər Mədinə şəhərinin əmiri idi.

Hədislə heç də qəsd olunmur ki, onlar namazın vaxtının tamamilə çıxmasından sonra namaz qılardılar, çünki onlar əgər belə etsəydilər, səhabələr bu əməllərini inkar edərdilər, çünki peyğəmbər – *salləllahu aleyhi va səlləm* – onlara bunu əmr etmişdi, beləki ondan zalım əmirlərə qarşı vuruşmaq haqqında soruşanda demişdi: “**Sizin aranızda namazı qıldırdıqları müddətdə olmaz!**”

Yəni; namazı öz vaxtında qıldırdıqları müddətdə onlarla vuruşmayın, əgər vaxtında qılmasalar vuruşun!

---

[5] Muslim, 648

ən-Nəvəvi daha öncə keçən Əbu Zər'in hədisinin şərhində dedi: "**Qəsd olunan namazı ixtiyarı vaxtından[6] gecikdirməkdir, yoxsa tamamilə vaxtından sonraya gecikdirmək qəsd olunmur, çünki əmirlərdən bizə nəql olunan hallarına görə sadəcə namazları öz ixtiyarı vaxtlarından sonraya gecikdiriblər, beləliklə xəbərləri mövcud reallığa uyğun şəkildə yozmaq lazımdır.**" Muslimin şərhindən gətirilən sitat burada bitdi.

Həccac'ın cümə namazını vaxtı çıxana qədər bir gün gecikdirməsi haqqında gəlmiş xəbər ilə ən-Nəvəvi'nin dediklərini inkar etmək olmaz, çünki bu, nadir bir haldır və məlumdur ki, hədisləri buna aid etmək olmaz, çünki bizə gəlmiş tarixi əsərlər göstərir ki, əməvilərin adəti namazı ixtiyarı vaxtından gecikdirmək olmuşdur.

əş-Şəvkani dedi: "**Əvvəlki və son dövr əmirlərin hallarından bizə nəql olunan namazın ixtiyarı vaxtından gecikdirilməsidir, onlardan heç biri namazı bütün vaxtından sonraya gecikdirməzdi, beləliklə hədisləri reallığa uyğun olaraq yozmaq lazımdır.**"

Əbu Zər'in sözü keçən hədisi dəlalət edir ki, namazı öz ixtiyari vaxtında qılmayan imamın arxasında qılınan namaz səhih deyildir, çünki əgər səhih olsaydı peyğəmbər – *salləllahu aleyhi va səlləm* – Əbu Zər'ə tək namaz qılmasını və hər bir müsəlmanın üzərinə vacib olan camaat namazını tərk etməsini əmr etməzdi.

O zaman peyğəmbərin namazı ixtiyarı vaxtından sonraya gecikdirən imamların arxasında namaz qılmağı qadağan etməsinin səbəbi nə idi?!

Səbəb namazın batil olmasıdırmı?

Namazın batil olmasının axtardığımız səbəb olması doğru deyildir, çünki alimlər ittifaq ediblər ki, namazı ixtiyarı vaxtından sonra qılmaq namazı batil etmir. Əgər hal belədirsə o zaman hədisdə sözü gedən imamların arxasında namaz qılmağı peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – qadağan etməsinin səbəbi namazı peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – qıldığı vaxtından gecikdirməklə sünnətə müxalif olmaqlarıdır.

Mənası budur ki, sünnətə müxalif olan imamın arxasında namaz qılmaq səhih deyildir, çünki əgər arxasında namaz qılmaq səhih olsaydı peyğəmbər – *salləllahu*

[6] Namazın ixtiyarı vaxtı və zəruri vaxtı dedikdə, insanın ixtiyari vaxt içində dilədiyi vaxtda qılmaqda sərbəst olduğu anlaşılır, lakin səbəbsiz yerə namazı ixtiyarı vaxtından zəruri vaxtına gecikdirən günah qazanmış olur.

*aleyhi va səlləm* – Əbu Zər'ə tək namaz qılmasını və onun üzərinə vacib olan camaat namazını tərk etməsini əmr etməzdi.

Hədisdə zikr olunan imamların arxasında namaz qılmağın nəhy olunmasının səbəbinin sünnətə müxalifət olmasını kim inkar edərsə, gərək digər səbəbin olmasını etiraf etməsi lazımdır və digər səbəb budur ki, namazı ixtiyari vaxtından sonraya gecikdirmək aşkar bir masiyətdir. Bu isə səhih bir səbəbdir. Lakin bunun səhihliyi əməvilərin namazı asilik vaxtına qədər gecikdirdiklərinin isbat olunmasından asılıdır. Əgər bu sabit olarsa, o zaman mənası bizim dediyimiz olacaq; yəni aşkar masiyət edən imamın arxasında namaz qılmaq səhih deyildir. Heç kəsdən gizli deyildir ki, masiyət olan bu əməl – hətta görüşümüzü inkar edənlərin etirafı ilə - sünnətə müxalifdir və bu, insaf sahibi hər ağıllı insan üçün aydındır.

Buna əsasən mübtədi və aşkarda fasiqlik edən birinin arxasında namaz qılmağın caiz olmamasına Əbu Zər'in hədisi açıq bir dəlildir.[7]

Bunu biz ondan anlayırıq ki, o imamların arxasında peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – namaz qılmağı qadağan etməsinə səbəb olan əməlin üç vəsfi vardır:

Birinci: namazın batil olması

İkinci: sünnətə müxalif olması

---

[7] Maraqlı tərəf budur ki, mübtədi və aşkarda fasiqlik edənlərin arxasında namazı səhih sayanlar da məhz Əbu Zərr'in bu hədisini dəlil gətirirlər. Şeyx Muhamməd bin İsmayıl əl-Əmir əs-San'ani – rahiməhullah –deyir: "Şafilər və hənəfilər (belə birinin) imamlığının səhih olması görüşündədirlər; bunun üçün qarşıda gələcək İbn Ömər'in hədisini və digər hədisləri dəlil gətirirlər. Bu hədislərin sayı çoxdur və saleh və ya facir imamın arxasında qılınan namazın səhihliyinə dəlalət edir, lakin bunların hamısı zəif hədislərdir. Bu hədislərin qarşı tərəfində "Dinində cürət sahibi sizə imamlıq etməsin" hədisi və buna bənzər durur, lakin bu hədislər də həmçinin zəifdir. Dedilər ki, əgər hər iki tərəfin hədisləri zəif olarsa əslə dönməliyik və əsli qayda budur ki, kimin namazı səhihdirsə imamlığı da səhih olmalıdır. Səhabələrin əməli də bu qaydanı dəstəkləyir, beləki əl-Buxari "ət-Tarix" əsərində Abdul-Kərim'dən belə dediyini rəvayət edir: "Muhammədin – salləllahu aleyhi va səlləm – səhabələrindən on nəfər ilə qarşılaşdım və onlar zalım imamların arxasında namaz qılardılar."Bunu həmçinin Muslimin hədisi də dəstəkləməkdədir: "Namazı vaxtından sonraya gecikdirən əmirlər başınıza gəlsə nə edəcəksən?" Dedi: "Nə etməmi buyurursan?" Dedi: "Namazı öz vaxtında qıl və əgər onların qıldığı namazla qarşılaşsan onlarla da qıl, çünki sənin üçün nafilədir."Beləliklə onların arxasında namaz qılmağa icazə verdi və namazı vaxtından gec qıldıqları üçün bu namazı nafilə saydı. Hədisin zahiri mənasından anlaşılır ki, əgər həmin əmirlər namazları öz vaxtında qılsaydılar onların arxasında namazları fərz olaraq qılmaqla əmr olunardılar." ["Subulus-Sələm əl-Muvsilətu ilə Buluğil-Məram", 3/82; Daru İbnil-Cəvzi, Səudiyyə Ərəbistan, ikinci nəşr: hicri 1421]

Üçüncü: masiyət olması

Əgər birinci sifətə baxsaq sözü gedən qadağa üçün səbəb olmasının səhih olmadığını görərik, çünki alimlərin ittifaqı ilə belə bir şey bu əməldə yoxdur.[8]

Buradan anlayırıq ki, qadağanın səbəbi ikinci və üçüncü vəsflərdir, beləliklə biz də bu vəsflərin tələbinə əsaslandıq.

Allaha hidayətinə və təvfiqinə görə həmd olsun!

Sözü gedən hədisdən anlaşılır ki, sünnətə müxalif olan imamın arxasında – sünnətə müxalifəti namazın əməllərindən başqa işlərdə olsa belə - qılınan namaz səhih deyildir, çünki namazı gecikdirən imamların arxasında namaz qılmağın qadağan olunmasının səbəbi təsdiq etdiyimiz kimi sünnətə müxalif olmaq və masiyətdir.

Bu isə alimlərin ittifaqı ilə namazı batil etmir, beləliklə aydın olur ki, hədisin mənasında namazdan kənar olan bir əməl vardır. Bunun təsdiqi budur ki, namazı ixtiyarı vaxtından sonraya təxirə salmaq bütün məzhəblərin ittifaqı ilə namazı batil etmirsə anlayırıq ki, bunu edən imamların arxasında namaz qılmağın qadağan olunmasının səbəbi bizim zikr etdiyimiz vəsflərdir və bu, sünnətə müxalif olma və masiyətdir. Hamı bilir ki, sünnətə müxalif olma və masiyət namazın hərəkətlərindən kənarda mövcud olan əməllərdəndir.

Bizin bu anlayışımızı dəstəkləyən dəlillərdən biri də budur ki, bir nəfər səhabələrdən bir qrupa imamlıq etdi və qiblə istiqamətində tüpürdü. Namazı bitirdikdə Allahın Elçisi – *salləllahu aleyhi va səlləm* – dedi: "**Sizə namaz qılmamalıdır!**" Həmin insan peyğəmbərdən – *salləllahu aleyhi və səlləm* – onun imamlığını qadağan etməsinin səbəbini soruşdu. Dedi: "**Sən Allaha və Elçisinə əziyyət etdin!**" Bunu Əbu Davud rəvayət etmiş və əl-Hafiz "Fəthul-Bari" kitabında bu hədis haqqında susmuşdur.[9]

Bu hədisdə dəlil vardır ki, peyğəmbərə - *salləllahu aleyhi va səlləm* – görə sünnətə müxalif olmaq imamlığa mane olur, necəki biz bunu Əbu Zər'in hədisindən anladıq. Çünki alimlərin ittifaqı ilə qibləyə tərəf tüpürməklə namaz batil olmur, belə bir şey sadəcə olaraq Allaha ədəbsizlik sayılan bir əməl ilə sünnətə müxalif olmaqdır.

---

[8] Yəni, namazı ixtiyarı vaxtından sonraya saxlamaq namazı batil etmir, ona görə də peyğəmbərin – salləllahu aleyhi va səlləm – o cür imamların arxasında namaz qılmağı qadağan etməsi bu səbəbə görə ola bilməz.

[9] Hədisi Əbu Davud "əs-Sünən"də (481) rəvayət edir. Əbu Davud və əl-Muzəni hədis haqqında susublar. Şeyx əl-Albani – rahiməhullah "əs-Sünən" əsərinin təhqiqində hədisi həsən saymışdır.

Qeyd olunmuş Əbu Zər hədisindən ictihadı ilə sünnətə müxalif olan imamın imamlığını səhih sayanların görüşünün batil olduğu anlaşılır, çünki Bənu Umeyyənin əmirləri ictihadlarına əsasən namazı gecikdirərdilər, necəki "əl-Muvatta" əsərindəki birinci hədis buna dəlalət edir, çünki məlum olduğu kimi Ömər bin Abdul-Aziz bir müctəhid idi.

Mənası budur ki, ictihad bizim üçün ictihadı ilə sünnətə müxalif olmuş birinin arxasında namaz qılmağı bizə mübah edən bir üzr deyildir.

Bəli...açıq-aşkar bir dəlilin varid olmadığı məsələlərdə məzhəblərin bir-birilərinə müxalifət etməsi imamlıqda etibara alınmaz.

Peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – Əbu Zər'ə əmirlərlə birlikdə yenidən namaz qılmağı əmr etməsi əmirlərdən gələ biləcək əziyyətdən qorunmaq, zərəri dəf etmək üçündür, çünki bu əmrlər namazı itaətin əlaməti sayırdılar və çünki bu imamlar beş namazı və cüməni insanlarla birlikdə qılardılar.

Əbu Zər hədisindən anlaşılır ki, imamın sünnətə müxalif olması camaat namazını vaciblik hökmündən düşürən bir üzrdür, çünki peyğəmbər – *salləllahu aleyhi va səlləm* – Əbu Zər'ə tək namaz qılmağı və vacib olan camaat namazını gözləməməyi əmr etdi.

Əgər namazın əməllərindən kənar bir işlərdə sünnətə müxalif olmaq imamlığı batil edirsə, bu, o mənaya gəlir ki, namazı batil edən əməllərlə sünnətə müxalif olmağın imamlığı da batil etməsi daha uyğun, daha doğrudur.

Hamıya məlumdur ki, mübtədi imamlar namazın daxilindəki əməllərdə sünnətə müxalifdirlər.

Bizim zikr etdiyimizdən aydın olur ki, sünnətə müxalif olan imamın arxasında namazın səhih olmaması barədə Əbu Zər'in hədisi aşkar bir dəlildir.



İkinci dəlil:

Hədis: “**Üç nəfərin namazı qulaqlarından o tərəfə keçməz: qaçmış qul, elə bir qövmə imamlıq edən kəs ki, o qövm həmin adamı sevmir...**” əl-hədis. Bunu ət-Tirmizi rəvayət etmiş və həsən saymışdır.[10]

Hədisin mənası:

Sünnətə müxalif olan imamın namazı qəbul deyildir, çünki insanların sevməməsi səbəbilə namazı qəbul olmayan imam o imamdır ki, insanlar onun imamlığını zülmünə və sünnətə müxalifətinə görə sevmirlər.

Lakin dünya məsləhətlərinə görə və sünnətə tabe olduğuna görə sevilməyən imama gəldikdə isə, burada günah imamın üzərinə deyil, onu sevməyənlərin üzərinə düşür.

Bunu bu cür əl-Xattabi və ən-Nəvəvi hədisin şərhində deyiblər.

---

[10] ət-Tirmizi “əs-Sünən”də (360)rəvayət etdi və “həsən ğaribdir” dedi. Eləcədə İbn Əbi Şeybə (3/558), ət-Tabərani “əl-Kəbir”də (8/284; hədis: 8090, 8098) və əl-Bəğavi “Şərhus-Sunnə”də (3/404) rəvayət ediblər. İsnadında Əbu Ğalib əl-Basri adlı ravi vardır və alimlərin onun haqqındakı görüşləri fərqlidir. ən-Nəsai, Əbu Hatim, İbn Sad, İbn Hibban və əz-Zəhəbi onu zəif ravi sayıblar və buna görə də əl-Beyhəqi “əs-Sünən” əsərində (3/128) hədisin güclü olmadığını deyir. Lakin bu ravini əd-Dəraqutni siqa sayıb, Yəhya bin Main isə hədisdə saleh olduğunu demişdir. İbn Hacər saduq olduğunu, lakin xəta etdiyini deyir. Bəşər Avvad və Şueyb əl-Arnavut “ət-Təqrib” kitabının (4/249) təhrirində deyirlər: “Əksinə zəifdir, mutabiat və şahid qismində gələn rəvayətlərdə etibara alınmalıdır.” Orta görüş budur ki, bu ravinin hədisləri həsəndir, buna görə də ət-Tirmizi hədisi həsən saymışdır. ən-Nəvəvi – rahiməhullah – “əl-Xulasə”də (2/703) deyir: “Bunu ət-Tirmizi rəvayət edib və həsən olduğunu deyib. əl-Beyhəqi isə zəif sayıb, lakin ət-Tirmizinin rəyi daha doğrudur.” Hədisi həmçinin Şeyx əl-Albani “Ğayətul-Məram”da (248), “Sahih ət-Tərğib vat-Tərhib”də (1/328; hədis 487) və “əl-Mişkat”da (1/350; hədis 1122) həsən sayır. Hədisin isnadı həmçinin Şueyb əl-Arnavut “Şərhus-Sunnə”də (3/404) həsən sayır. Hədisi mühəddis Əhməd Şakir “Sünən ət-Tirmizi”nin şərhində (2/192) səhih sayır. Şeyx Muqbil əl-Vadii bu hədisi “əl-Camius-Sahih mimmə leysə fis-Sahiheyn”də (2/148) zikr etmişdir.

Hədisin mənası budur ki, sünnətə müxalif olan imamın - əgər onun arxasında namaz qılanlar sünnətə müxalif olmasına görə onun imamlığını sevmirlərsə - namazı qəbul deyildir, əgər onun namazı məqbul deyilsə onun arxasında duran məmumların namazı da qəbul olunmur, çünki imamın namazının batil olduğunu bildiyi halda onun arxasında namaz qılan məmumun da namazının batil olmasında məzhəblər ittifaq ediblər. Gətirdiyimiz hədisin aşkar dəlalətinə əsasən insanların imam olmasını istəmədikləri bir imamın namazı batildir, çünki çox sayda hədisin dəlalət etdiyi kimi peyğəmbərin istilahında namazın səhih olmaması namazın məqbul olmaması ilə ifadə olunur. Buna misal olaraq bu hədisi göstərmək olar: "**Dəstəmazını pozan kəs dəstəmaz almayana qədər Allah namazını qəbul etməz.**"[11] Yəni dəstəmazını pozmuş kəsin namazı səhih deyildir.

Səhihlik və qəbul olunma arasında fərq qoyan təqlid əhli isə heç bir dəlil olmadan açıq-aşkar səhih hədislərə qarşı çıxırlar; bunu "əl-Huccətul-Vadihə" kitabında izah etmişəm.

Sünnətə müxalif olan imamın namazı dəstəmazsız halda insanlara namaz qıldıran imamın namazı kimidir. Şərəfli hədisin aşkar dəlalətinə əsasən onların hər ikisinin namazı batildir, səhih deyildir.



[11] əl-Buxari (135), Muslim (225)

Üçüncü dəlil:

Hədis: “**Allahın göndərdiyi elə bir peyğəmbər olmayıb ki, ümməti içindən onun həvariləri olmasın. Sonra onların arxasında etmədiklərini söyləyən xələfləri gəlir. Kim onlarla əli ilə cihad edərsə o, mömindir. Kim dili ilə onlara qarşı cihad edərsə o, mömindir və kim qəlbi ilə onlara qarşı cihad edərsə o, mömindir və bundan sonra xardal dənəsi qədər belə iman yoxdur.**” Muslim rəvayət etmişdir.[12]

Bu hədisdə ümmətdə üzə çıxacaq mübtədilər haqqında xəbər gəlmişdir. Peyğəmbər – *salləllahu aleyhi va səlləm* – onlara qarşı cihad edənləri tərifləmiş və onların imanlarına şahidlik etmişdir. Eləcədə xəbər vermişdir ki, onlarla cihad etməyənlərin qəlbində heç xardal dənəsi qədər belə iman yoxdur.

Heç kəsdən gizli deyildir ki, möminin mübtədilərə qarşı apardığı cihadın ən böyük növlərindən biri də onların arxasında namaz qılmağı tərk etməkdir, çünki bunun nəticəsində mübtədilər təsirlənirlər və ağrı hiss edirlər. Belə bir şey onların əleyhində pis bir propaqanda olur ki, insanları onlardan uzaqlaşdırır və insanların qəlbində onlar haqqında elə bir məqam qoymur ki, onun xatirinə insanlar onlara tabe olsunlar.[13]

---

[12] Muslim (50)

[13] Ümməti bürümüş ən böyük fəlakətlərdən biri də budur ki, bu günümüzdə minbərlərdə hər növ fasiq, zındıq və kafir zümrə görmək olar. Minbərlərdə Putin, Buş və Obama kimi İslam düşməni kafirlərə “Allah prezidentimizdən razı olsun!” deyib duran məscid imamları görmək çətin deyil. Bu cür məscid imamları Rusiyadan tutmuş və Amerikaya qədər çox məscidlərdə görülə bilər. Belələrinin halı heç də öz ağalarından fərqli deyildir. Bu cür insanların arxasında nə camaat namazı, nə də cümə namazı qılınmaz, qılınan namazların təkrarlanması lazımdır. İmam əl-Qadi İyad əl-Maliki – rahiməhullah – maliki alimlərinin həyatı haqqında yazdığı kitabında Əbu Bəkr İsmayıl bin İshaq bin Uzra əl-Ənvi haqqında danışarkən deyir: “İbn Əbi Zeyd onu gəncliyində kitabında çox tərifləmişdir, çünki ondan Bənu Ubeyd dövlətinin xatibləri haqqında soruşuldu və onların sünni olduqlarını dedilər. O

zaman soruşdu: "Məgər onlar – "Allahım, qulun əl-Hakimə və Yer üzünün varislərinə xeyir-dua et!" – demirlərmi?" Dedilər "bəli!" Dedi: "O zaman xütbə verib Allaha və Elçisinə ən gözəl şəkildə tərif və sənalar gətirən və daha sonra "Əbu Cəhl cənnətdədir" deyən xatib haqqında nə düşünürsüz? O, kafir olurmu?" Dedilər "Bəli!" Dedi: "Bu əl-Hakim'in şərri Əbu Cəhl'dən də şiddətlidir." Bunu Qadi İyad – rahiməhullah – kitabında zikr edir. Bənu Ubeyd isə fatimilər dövlətini idarə etmiş sülalənin adıdır və əl-Hakim o sülalənin kafir əmirlərindən biri olmuşdur. əl-Qadi İyad bin Musa daha sonra deyir: "əd-Davudi'dən bu məsələ haqqında soruşdular və dedi: "Cümə günü onlar üçün xütbə verən və onlara dəvət edən xatibləri kafirdir və öldürülməlidir, tövbəyə dəvət edilməz, xanımı ona haramdır, nə miras almaz, nə də miras buraxmaz. Onun malı müsəlmanlara aid bir feydir, "ummul-valəd"(o kənizlər ki, onlardan uşağı olmuşdur) olan qulları azad edilməlidir. Öləcəyi halda azad olması şərtinə sahib olan qullar da müsəlmanlara aiddir və onların üçdə bir hissəsi azad edilməlidir, çünki onun heç bir malı qalmamışdır. Pul ödəmə qarşılığında azad olunacaq qulların mülkiyyəti də müsəlmanlara aiddir, əgər pulu ödəsələr azad olunurlar, aciz olsalar qul olaraq qalacaqlar. Onun bütün hökmləri kafir hökmləridir. Əgər peşmanlığını göstərərək vəzifəsindən alınmadan əvvəl və onların dəvətlərini qəbul etməmiş olaraq tövbə edərsə tövbəsi qəbul edilər. Vəzifədən alındıqdan sonra və ya (tövbə etməsinə) mane olan bir şeydən sonra tövbə edərsə, tövbəsi qəbul olunmaz. Kim onun arxasında qorxaraq (cümə) namazı qılarsa, namazını zöhr namazı kimi dörd rükət olaraq yenidən qılmalıdır. Sonra əgər ordan çıxa bilərsə, orda oturması caiz deyildir. Uşaqlarının çox olması və digər səbəblərə görə üzrlü sayılmaz." əl-Qadi İyad daha sonra Əbu Muhamməd bin əl-Kəbrani'nin tərcümeyi-halından yazarkən bunu deyir: "Əbu Ubeydin dəvətlərinə girməyə məcbur etdikləri, əks təqdirdə öldürəcəkləri bir adamın halı haqqında soruşdular. Belə buyurdu: "Ölümü seçməlidir, heç kimsə belə bir şeyə görə üzrlü sayılmaz. Yalnız onların (yəni fatimi əmirlərin) hallarını bilmədən öncə ölkəyə daxil olanlar istisnadır, onların halını bildikdən sonra onlardan qaçması vacibdir. Ölkədə yerləşdikdən sonra qorxusu səbəbilə (dəvətlərinə razı olmasına görə) üzrlü sayılmaz, çünki əhalisindən şəriətin qüvvədən salınmasının/şəriətə əməl edilməməsinin tələb edildiyi bir məkanda yerləşməsi caiz deyildir. Orada (fatimilərin ölkəsində) yerləşmiş alimlər və ibadət əhli isə yalnız və yalnız onlara qarşı olmaq şərti ilə yerləşmişdirlər ki, müsəlmanları düşmənləri ilə baş-başa buraxaraq onları dinlərində fitnəyə düşürməsinlər. Cəbələ bin Həmud və onun bənzərlərindən olan Rabi əl-Qattan, Əbul-Fadl əl-Humsi, Mərvan bin Nəsrun, əs-Səbbəi və əl-Cubeynəni bu əməl üzərində idilər, danışar və fətva verərdilər. Yusuf bin Abdilləh ər-Raini kitabında deyir: "Əbu Muhamməd bin Əbi Zeyd, Əbul-Həsən əl-Qabisi, Əbul-Qasim bin Şəlbun, Əbu Əli bin Xaldun, Əbu Muhamməd ət-Tabiqi, Əbu Bəkr bin Uzra kimi Qayravan alimləri icma ediblər ki, Ubeyd oğullarının halı mürtəd və zındıqların halı ilə eynidir. Şəriətə müxalif əməllər göstərdikləri üçün mürtəd halındadırlar və icma ilə heç kəs onlara varis olmaz. Münafiq olmaqlarının səbəbi isə (şəriəti) qüvvədən salmaq kimi gizlətdikləri nifaqdır və zındıqlar olaraq öldürülməlidirlər. Alimlər deyirlər: "Digər küfrlərdən fərqli olaraq heç kimsə onların bu məzhəblərinə güc ilə, məcburiyyət qarşısında girməyə görə üzrlü sayılmaz, çünki onların küfrlərini bildikdən sonra (onların ölkəsində) məskən salmışdır. Küfrə girmədən öldürülməsinə üstünlük verənlər istisnadır. (Məşhur maliki imamı) Sahnun'un tələbələri məhz bu görüş ilə müsəlmanlara fətva verərdilər. Əbul-Qasim əd-Duhhəni dedi: "Onlar kafirlərdən fərqlənirlər, çünki onların küfrünə həm də sehr qarışmışdır və kim onlara qoşularsa həm sehrə, həm də küfrə bulaşmış olar. Trablus (Tripoli) sakinləri Ubeyd oğullarının yanına gətirilərkən məcbur edildikləri halda onların dininə daxil olacaqlarına qərar verdilər, lakin

Mübtədilərə qarşı müharibə etmək və eyni zamanda arxalarında namaz qılmaq ağla sığmayan bir şeydir, çünki onların arxasında namaz qılmaq onların xoşuna gəlir, onları sevindirir və imamın bir fəzilət və xeyir sahibi olduğuna etiqad edən adi cahil insanların qəlblərində onlara qarşı bir hörmətin yaranmasına səbəb olur. Əgər bir cənazə olsa həmin mübtədini ora çağıracaqlar, əgər bir ziyafət olsa eyni şeyi edəcəklər. Eynilə hər bir münasibətdə həmin imam çağırılan birinci şəxs olacaq və müşahidə olunan bir şeydir.

Məgər bu dediklərimizi nəzərə alaraq mübtədi imamın arxasında namaz qılmaqla birlikdə onlara qarşı müharibə etmək doğrudurmu?! Halbuki peyğəmbər – *salləllahu aleyhi va səlləm* – onlara qarşı müharibə etməyi əmr etmiş və bunu etməyən kəslərin imanı olmadığını demişdir. Allaha and olsun ki, xeyr!

Lakin cahillər cahilliyin zülmətində azırlar. Məhz buna görə sələf deyərdi: "**Kim bidət sahibinə hörmət edərsə İslamın dağılmasına kömək etmişdir.**" Bir mübtədi üçün onu İslamın ən şərəfli məqamı olan namazda imamlıq üçün önə keçirməkdən böyük hörmət ola bilərmi?![14]

---

yoldan sağ-salamat qaytarıldılar. İbn Əbi Zeyd dedi ki, onlar kafirdirlər, çünki belə bir şeyə etiqad ediblər." ["Tərtibul-Mədarik va Təqribul-Məsalik li-Mə'rifəti Ə'aləmi Məzhəbi Məlik", 7/275-278; Mərakeş krallığı, Vizaratul-Əvqaf vaş-Şuunil-İsləmiyyə, birinci nəşr: 1402/1982] Fatimilər öz zamanında Muhamməddin – salləllahu aleyhi va səlləm – şəriətini qüvvədən endirmişdilər, onlar Muhamməd bin İsmayılı peyğəmbəri saydıqları üçün Muhamməddin – salləllahu aleyhi va səlləm – şəriətinin nəsx edildiyinə etiqad edirdilər. Alimlər o zaman bu zümrəyə qarşı ən son dərəcə şiddətli idilər. Rumlular, məcusilər və başqa kafirlərdən öncə bu batini ismailiyyə şiələrə qarşı cihadı fərz görərdilər.

[14] Kitaba əlavə etdiyimiz qeydlərdə müsəlmanlara məsələ haqqında ətraflı məlumat verməyə çalışırıq. Bu məsələdə yalnız bir tərəfin görüşünü qeyd etməklə kifayətlənmək doğru olmazdı. Beləliklə bura qədər söylənənlərdən anlaşıldı ki, bidətinə dəvət edən bidət əhlinin və fasiqliyini aşkarda göstərən fasiqin arxasında namaz qılmaq haqqındakı görüşlər fərqlidir. Maliki və hənbəli məzhəblərinə görə bu kəslərin arxasında qılınan namaz səhih deyildir. Şafi və hənəfi məzhəblərinə görə səhihdir. Lakin burada orta mövqeyi də qeyd etmək lazımdır ki, Şeyxul-İslam İbn Teymiyyə - rahiməhullah – bu orta görüş haqqında sözlərinin birində deyir: "Hava və bidət əhli arxasında və facirlər arxasında namaz qılmağa gəldikdə bu barədə məşhur bir ixtilaf var və bu məsələnin təfsilinə girişmək bu yerdə münasib deyildir. Lakin onlar haqqında söylənmiş bu görüşlərin arasında ən orta görüş budur ki, başqasını imam qoymaq imkanı olduğu halda bu kimsələrdən (yəni bidət və fisq əhli) hər hansı birini imam kimi önə keçirmək caiz deyildir. Beləki facirliyi və bidətlərini aşkarda üzə vuran birinin inkar olunması və bu əməllərindən qadağan olunması vacibdir. İnkarın ən aşağı dərəcəsi isə bidətlərindən və facirliyindən əl çəkməsi üçün onu tərk etməkdir. Buna görə də alimlərin əksəriyyəti (bidətinə) dəvət edən ilə dəvət etməyən arasında fərq qoyublar, çünki dəvət edən münkəri nümayiş elədiyi üçün inkar olunmağa



layiqdir; belə biri sakit durandan fərqlidir, çünki sakit biri günahını gizlədən biri kimidir. Günahını gizlədənlər isə aşkarda inkar edilməzlər, çünki günah gizli olarsa sahibindən başqa heç kimsəyə zərər verməz, lakin aşkarda edilərsə və inkar olunmazsa, digər insanlara da zərər verər." ["Məcmu əl-Fətava", 23/342] Şeyxul-İslamın bu sözlərindən aydın olur ki, hər kəs imamlığa layiq deyildir və əgər imamlığa uyğun olan birinin olduğu halda uyğun olmayan birini imamlığa keçirmək haramdır, çünki vacib olanı tərk etmək haramdır. Belə halda müsəlmanlara bu nöqtəyə diqqət etmələrini tövsiyə edirəm.

Dördüncü dəlil:

İslamda təsdiq olunmuş qaydalardan da biri budur ki, kim içində aşkar bir münkərin olduğu bir yerə gələrsə həmin münkəri dəyişmək ona vacibdir. Əgər bunu bacarmırsa həmin yerdən çıxması vacibdir və əgər çıxmazsa həmin münkəri edənlər kimi asi olur, çünki ayə buna dəlalət edir: "... o zaman siz də onlar kimi olarsız!"

Sünnətə - elə bir sünnət ki, ona qarşı çıxmağın böyük bir münkər, aşkar bir zəlalət olmasında ixtilaf yoxdur - müxalif olduğunu gördüyü halda onun arxasında namaz qılan kəsə imamın sünnətə müxalif olmasını inkar etmək vacibdir. Əgər bunu bacarmırsa onun olduğu məsciddə qalması ona caiz deyildir, əks təqdirdə onun kimi asi olar.

Daha əvvəl qeyd etdik ki, imam sünnətə müxalif olmaqda ictihadına görə üzrlü sayılmaz, çünki açıq-aşkar dəlil olan bir yerdə ictihad batildir. Malikə tabe olaraq namazda təavvuz etməyən imam üzrlü sayılmaz, əksinə hədisdə gəldiyi kimi o, Maliki Allahdan başqa bir rəbb etmiş müşrikdir. Buna baxmayaraq bu zamanımızda imamlar təqlidə əsaslanaraq sünnətə müxalif olurlar ki, bu da Allaha şərik qoşmaqdır və imamları Allahdan başqa rəblər olaraq qəbul etməkdir.

İxlas və münafiqlikdən təmizlənmək yalnız sünnətə müxalif olanların arxasında namazı tərk etməklə olur, beləki arxasında namaz qıldığı imamın sünnətə müxalif olduğunu bilən kimsə onun arxasında namaz qılmaqla onu təzim etmiş olur və onun haqqında imamlıq ilə təsdiq etdiyi fəzilətə şahidlik etmiş olur.

Lakin ondan bu haqda soruşsalar bunun tam əksini söyləyəcək. Yəni deyəcək ki, o, sünnətə müxalifdir, öz imamını Allahdan başqa bir rəbb etmişdir, beləliklə Allaha şərik qoşmuşdur. Sünnətlə əməl edən biri sünnətə müxalif olan imam haqqında bax belə deyəcək. Beləliklə münafiq olacaq, əməli ilə sözü düz gəlməyəcək; əməli imamın

fəzilətinə dəlalət edəcək, sözü isə imamının şirk qoşmasına, bidət etməsinə dəlalət edəcək. Əsl nifaq da elə budur!

Bəs nə üçün cahillər sünnətin imamlığın şərtlərindən bir şərt olmasını inkar edirlər?! Halbuki həddi-büluğa çatmağın imamlıq üçün şərt olduğunu söyləyən Malik, Əbu Hənifə və zahirilərin bu görüşlərini bunun əksini söyləyən hədisin olmasına baxmayaraq inkar etmirlər!!! Sünnətə əməl etmək həddi-büluğa nisbətdə namaza daha yaxın və ona daha münasibdir. Eynilə Malikin imam ilə məmumların niyyətlərinin eyni olması şərtini qoşmasını inkar etmirlər, halbuki bunun əksini söyləyən açıq-aşkar bir dəlil gəlmişdir.

Əgər sünnətə müxalif olmağın namazla heç bir əlaqəsinin olmadığını desələr deyərik ki, niyyətlərin fərqli olması və həddü-büluğa çatmaq da bunun kimidir...Həddi-büluğa çatmamış o qədər uşaq vardır ki, namazı böyüklərin namazından daha gözəl və daha kamildir! Nə üçün bunu inkar edib o birini qəbul edirsiz?! Bunun səbəbi gözləri kor edən təqliddən başqa bir şey deyildir.



## FƏSL

Cahillər sünnətə müxalif olanın və fasiqin imamlığının səhih olması yönündə bu hədisi gəlil gətirirlər: **"Lə iləhə illəllah" deyən kəslərin arxasında namaz qılın!"**[15] Bu, batil bir dəlilləndirmədir, çünki hədis mühəddislərin ittifaqı ilə zəifdir.

"**Hər əməli-saleh və facir arxasında namaz qılın**"[16] hədisi isə hədis deyildir.

"**Sizə namaz qılacaqlar, əgər doğru eləsələr, sizin xeyrinizədir və əgər xəta etsələr sizin xeyrinizədir, onların isə əleyhinədir**"[17] hədisinə gəldikdə isə burada onların iddiasını isbat edən heç bir dəlil yoxdur, çünki buradakı "xəta" qəsdən edilmiş xətanın ziddidir. Bu sanki imamın xəta edərək dəstəmazsız namaz qılmasına və ya paltarında nəcəs olduğu halda xəta edərək namaz qılmasına və yaxud da xəta edərək qiblədən başqa istiqamətə namaz qılmasına bənzəyir, beləliklə bunları bilməyərək belə bir imamın arxasında duranın namazı səhih olacaq.

Burada bəzilərinin iddia etdiyi kimi xəta ilə qəsdən edilən xəta və günah qəsd olunmur, çünki əks təqdirdə bu hədis sözü keçən Əbu Zər hədisinə zidd olur, hansı ki, o hədisdə peyğəmbər – *salləllahu aleyhi va səlləm* – namazı vaxtından gecikdirən imamların arxasında namaz qılmağı qadağan etmişdir. Həmçinin qibləyə tərəf tüpürdüyünə görə peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – imamlıqdan qadağan etdiyi kəs haqqındakı hədislə də uyğun gəlmir.

---

[15] "əl-Aqidətut-Tahaviyyə" şərhində deyir: "Abdullah bin Ömərdən – radiyallahu anhu – rəvayət olunur ki, peyğəmbər – salləllahu aleyhi va səlləm – dedi: "Lə iləhə illəllah deyənlərin arxasında namaz qılın və lə iləhə illəllah əhlindən ölən kəslərə cənazə qılın!" Bunu əd-Dəraqutni bir çox yoldan rəvayət etmiş və onları zəif saymışdır." ["Şərhu Aqidətit-Tahaviyyə", 2/531; Muəssəsətur-Risalə, Beyrut, 1417/1997]

[16] əd-Dəraqutni "əs-Sünən"də (2/57), əl-Beyhəqi "əs-Sünən əl-Kubra"da (3/121), ət-Tabərani "əl-Əvsat"da (3/175) rəvayət edirlər. Hədis imamları bu və bunun kimi hədislərin səhih olmadığını deyirlər.

[17] əl-Buxari, 694

Lakin öz imamını təqlid edərək sünnəyə müxalif olan imam isə xətakar deyil, günahkar sayılır, öz imamını Allahdan başqa rəbb etmiş sayılır, belə biri isə müşrikdir,[18] necəki bu barədə Allahın Elçisindən – *salləllahu aleyhi va səlləm* – hədis varid olmuşdur.

Arxalarında namaz qılmağı tərk etmək yolu ilə bidət əhlinə qarşı cihad aparan kəsləri cahillər müsəlmanların birliyini parçalamaqda ittiham edərək onlara tənə edirlər. Heç kəsdən gizli deyil ki, belə bir söz sünnətdən və bidət və mübtədilərə qarşı müharibə etməyin vacibliyi haqqında peyğəmbərdən – *salləllahu aleyhi va səlləm* – varid olmuş rəvayətlərdən cahil olan birinin sözüdür. O zaman bu cahillər Əbu Zər'ə mübtədilər arxasında namaz qılmağı qadağan edən peyğəmbər – *salləllahu aleyhi va səlləm* – haqqında nə deyəcəklər?! Onun – *salləllahu aleyhi va səlləm* – bu əmri müsəlmanları parçalamaq, onların birliyini ayırmaq sayılırmı?!

Onların bir hissəsi deyir: "Müsəlmanlar Allaha həmd olsun ki, xeyir içindədirlər." Bu sözü söyləyən heç şübhəsiz ki, peyğəmbərin – *salləllahu aleyhi va səlləm* – bu hədisindən cahildir: "**Ümmətim yetmiş üç firqəyə parçalanacaq, onlardan yetmiş ikisi atəşdədir.**"[19] Allaha həmd olsun, əgər müsəlmanlar xeyir içindədirsə bəs o firqələr hardadır?!

"Sünnətə müxalif olanların arxasında namaz qılmağı qadağan edənlər müsəlmanları camaat namazının fəzilətindən məhrum edirlər" deyənlərin bu sözləri isə pak sünnətdən cahil olandan başqa heç kəsdən sadir olmaz. Biz buna cavab olaraq deyirik:

Allahın Elçisi – *salləllahu aleyhi va səlləm* – namazı vaxtından gecikdirən imamların arxasında namaz qılmağı qadağan etdi, nə etmiş sayılır? Məgər müsəlmanları camaat namazının fəzilətindən məhrum etmişdir? Üstəlik bilirik ki, namazda imamlıq edənlər başqaları deyil, məhz peyğəmbərin – *salləllahu aleyhi va səlləm* - arxalarında namaz qılmaqdan qadağan etdiyi əmirlər idi!

---

[18] Müəllif çox ehtimal ki, peyğəmbərin – salləllahu aleyhi va səlləm – görüşünü bildiyi halda və bu görüşün həqiqətən də ona aid olduğunu bildiyi halda öz məzhəbinin imamının görüşünə tabe olanlara işarə edir. Sözsüz ki, bu söz məzhəbə tabe olanlara aid olmaz, heç yaxına belə düşməz. Çünki məzhəb izləyən alimlərin demək olar ki, hamısı öz görüşlərində peyğəmbərin – salləllahu aleyhi va səlləm – sünnətinə tabe olduqlarına etiqad edirlər.

[19] Əbu Davud (4597), əd-Darimi (2560), Əhməd (4/102), İbn Əbi Asim (1,2, 65, 69), ət-Təbərani "əl-Kəbir"də (19/376), əl-Hakim (1/128) rəvayət edirlər. Hədisi əl-Hakim, əz-Zəhəbi, əl-İraqi, İbn Hacər, İbn Teymiyyə və digər böyük imamlar səhih sayıblar.

Müsəlmanların batil üzərində olduqları halda bir araya toplaşmaqları mühim deyildir, mühim olan onların haqq və sünnət üzərə olduqları halda bir arada birləşmələridir. Çünki batil bir şey üzərində toplaşanlar çox olsalar belə heç sayılırlar.

Namazın camaatla qılınması mühim deyildir, mühim olan namazın sünnətə müvafiq olmasıdır, çünki yüz camaat ilə qılınsa belə sünnətə müxalif olan namaz qəbul deyildir.

Onların İbn Ömərin əl-Həccac arxasında namaz qılmasını dəlil gətirmələri[20] batildir, belə bir şey üsul və sünnətdən cahil olan kəsdən başqa heç kəsdən sadir olmaz, çünki İbn Ömər əgər əl-Həccac'ın arxasında namaz qılıbsa onda əl-Həccac'dan qorxaraq namaz qılmışdır[21] və Həccacın zülmü və zorakılığı hamıya məlumdur. Tarixdən məlumdur ki, İbn Öməri öldürən də elə o özü olmuşdur, beləki həcdə İbn Ömər ondan önə keçirilərdi.

---

[20] İbn Ömərdən başqa digər səhabələrdən də bu yöndə dəlillər gəlmişdir. Abdullah bin əl-Xayyar rəvayət edir ki, "o, Osman bin Affan – radiyallahu anhu – evində mühasirədə olduğu zaman onun yanına girdi və dedi: "Şübhəsiz ki, sən camaatın imamısan, gördüklərimiz sənin başına gəldi və bizə bir fitnə başçısı imamlıq edir, bundan sıxıntı keçiririk." Dedi: "Namaz insanların etdiyi ən gözəl əməldir, əgər insanlar gözəl bir əməl edirsə sən də onlarla birlikdə et! Əgər pis əməl edirlərsə pis əməllərindən uzaq dur!" Bunu əl-Buxari "əs-Sahih"də (1/71; Darud-Dəavə) rəvayət edir. Cafər bin Muhammməd öz atasından rəvayət edir ki, "əl-Həsən və əl-Hüseyn – radiyallahu anhumə - Mərvan bin əl-Həkəm'in arxasında namaz qılardılar." Bu zaman soruşdular: "Məgər evlərinə geri döndükdə yenidən namaz qılmazdılarmı?" Dedi: "Xeyr, Allaha ans olsun ki, imamların arxasında qıldıqları namaza heç bir namaz əlavə etməzdilər." Bunu İmam əş-Şafi "əl-Umm" kitabında (1/185; Darul-Fikr, birinci nəşr; hicri 1400) və əl-Beyhəqi "əs-Sünən"də (3/122) rəvayət ediblər. Şeyx əl-Albani – rahiməhullah – deyir: "Əgər Əbu Cafər Muhammməd bin Əli bin əl-Hüseyn bin Əli bin Əbi Talib – radiyallahu anhum – iki babası əl-Həsən və əl-Hüseyn'dən hədis eşidibsə, o zaman bu hədisin sənədi Muslimin şərtinə görə səhihdir, çünki onun səhabədən heç kəsdən hədis eşitmədiyi söylənmişdir." İbn Əbiş-Şeybə isə "əl-Musannəf"də (2/151) əlavə edir: "Dedim: "İnsanlar iddia edirlər ki, onlar bunu təqiyyə olaraq ediblər." Cavabında buyurdu: "Axı bu necə ola bilər?! Mərvan vəli olduğu zaman minbərdə durduğu halda əl-Hüseyn bin Əli onun üzünə söyərdi?" Yəni bu iki böyük imamın Mərvanın arxasında namaz qılması bir təqiyyə deyildi, çünki əl-Hüseynin onun aşkarda üzünə söyməsi ondan qorxmadığını göstərir və əl-Hüseyn'in – radiyallahu anhu – mərdliyi və cəsarəti məşhurdur. Tabiin nəslindən böyük imam əl-Həsən əl-Basri deyir: "Sən namazını qıl, bidəti onun əleyhinədir." Bunu əl-Buxari "əs-Sahih"də (1/170) rəvayət edir. İbn Əbiş-Şeybə isə "əl-Musannəf"də (2/152) əl-Həsən əl-Basri'nin belə dediyini rəvayət edir: "Münafiqin arxasında namaz qılmaq möminə zərər vermir və möminin onun arxasında namaz qılması münafiqə xeyir vermir."

[21] Bu, doğru deyil, çünki İbn Ömərin – radiyallahu anhu – sözləri onu göstərir ki, o, qorxaraq deyil bunun caizliyinə etiqad edərək onların arxasında namaz qılmışdır. Onun bu barədəki sözləri çoxdur və hər biri özlüyündə bunu isbat etmək üçün kifayətdir.

Məcbur qalaraq və ya zalım və qəddar Həccacın zülmündən qorxaraq əməl etmiş məcburiyyət içində olan birinin o əməlini nümunə götürməyimiz doğrudurmu?!

Üsulda təsdiq olunmuş qaydalardan biri budur ki, bir səhabənin əməli digər bir səhabə ona müxalif olduğu təqdirdə hüccət sayılmaz. İbn Ömərə bu məsələdə mübtədinin arxasında namaz qılınıb qılınmayacağı haqqında soruşulduqda bunun qadağan olması yönündə fətva vermiş Vasilə bin əl-Əsqa müxalif olmuşdur. Onu da nəzərə almalıyıq ki, Vasilə bu fətvanı verərkən ixtiyar sahibi idi, məcburiyyət qarşısında deyildi. Üstəlik İbn Ömərə bu məsələdə heç bir səhabə müxalif olmasaydı belə Əbu Zər'in hədisi olduğu yerdə onun əməli heç cür hüccət ola bilməz, çünki cinlərə və insanlara göndərilmiş Allahın Elçisinin – *salləllahu aleyhi va səlləm* – kəlamı olduğu halda hər hansı kəsə Allahın dostu İbrahimin, Allahın peyğəmbəri Musa bin İmranın sözünü və digər göndərilmiş peyğəmbərlərin sözünü dəlil gətirmək imanı səhih olan heç bir möminə caiz deyildir.

Allah bizi zəlalət və çarəsizlikdən qorusun!

İmam Əhməd əmirlərin arxasında namazı caiz görərdi, mübtədilərin arxasında isə caiz görməzdi. Ola bilsin ki, zərurət səbəbilə edirdi və bu, onlardan qorxmaq idi.[22]

"Muvatta" əsərində isə gəlmişdir ki, Ömər bin Abdul-Aziz atası tanınmayan kimsəyə imam durmağı qadağan etmişdir.[23]

---

[22] Xeyr, Allaha and olsun ki, İmam Əhmədin həyatı bunun əksini göstərir. Zalım imamlara qarşı mərdlik və cəsarətlə durmuş və haqdan əl çəkməmişdir. Buna görə də başı ağrılar çəkmiş, hakimlər tərəfindən fitnələrlə imtahan edilmişdi. İmam Əhməd'in sözləri göstərir ki, zalım əmirlərə və daimi məscid imamlarına tabe olaraq onların arxasında namaz qılmaq peyğəmbərin – salləllahu aleyhi va səlləm – hədislərinin tələbidir.

[23] Yəhya əl-Leysi'nin rəvayəti ilə gəlmiş "əl-Muvatta" kitabında (1/134, hədis 303; Dar İhyə ət-Turas əl-Arabi, Misir) deyilir: "Malik mənə Yəhya bin Said'dən rəvayət etdi ki, bir nəfər əl-Aqiq'də (Mədinə şəhərinin yanındakı bir yerdə) insanlara namazda imamlıq edirdi. Ömər bin Abdil-Aziz onun yanına adam göndərərək ona imamlığı qadağan etdi." Malik dedi: "Onu bundan qadağan etməsinin yeganə səbəbi bu idi ki, həmin adamın atasının kim olduğu bilinmirdi." Müəllifin bunu burada qeyd etməsi ilə məqsəd sələfin zamanında imamlığa yalnız şərəf və seçkin xüsusiyyətlərə sahib olan kəsləri qoyduqlarını göstərmək üçündür. Alimlər zinadan doğmuş uşağın fasiq olduğunu və ya günah sahibi olduğunu demirlər, çünki uşaq ata-anasının etdiyi günahı daşımaz. Lakin əvvəlki mühafizəkar müsəlman cəmiyyətlərində şərəf və nəsəbə xüsusi fikir verirdilər. Buna görə də İmam Malik, İmam əl-Leysi zina uşağının imam qoyulmasını məkruh sayardılar, çünki imamlıq məqamı insanların onun haqqında söz danışmasına səbəb olacaq. əl-Hafiz Əbu Ömər İbn Abdil-Bərr – rahiməhullah – deyir: "İsa bin Dina dedi: "Malikin zina uşağının imamlığı haqqındakı görüşü ilə razı deyiləm və valideynlərinin günahı ona düşməz." Muhammədbin Abdilləh

“Sahih əl-Buxari”də gəlir ki, əz-Zuhri muxannəs[24] arxasında namaz qılmağı qadağan edərdi[25] və “əl-muxannəs” qadına bənzəyən kişilərdir.

---

bin Abdil-Hakim dedi: “Əgər özlüyündə imamlığa münasib olarsa zina uşağının imam olmasını məkruh görmürəm.” Əbu Ömər (İbn Abdil-Bərr) dedi: İmamlığın şərtləri haqqında bizə gəlmiş əsərlərdə nəsəbin nəzərə alınması haqqında heç bir şey yoxdur, bu əsərlərdə yalnız fiqh, Quran qiraəti və dində salehlik vardır.” [”əl-İstizkar”, 2/167;]

[24] əl-Hafiz İbn Hacər əl-Asqalani – rahiməhullah “əl-muxannəs” kəliməsi haqqında deyir: “Bu kəliməni “əl-muxannis” və “əl-muxannəs” olaraq rəvayət etmişik; birinci halda qəsd olunan özünü sındıraraq, qadın kimi davranaq və özünü qadına bənzədərək hərəkət edənlər qəsd olunur. İkinci halda isə homoseksual qəsd olunur. İbnut-Tin’in nəql etdiyinə görə Əbu Abdil-Məlik bu görüşü mənimsəmişdir və buna dəlil olaraq ona işarə etmişdir ki, birinci halda əgər insanın yaradılış şəkli elədirsə onun arxasında namaz qılmağa mane olacaq heç bir şey yoxdur. Bunu rədd edərək deyir ki, bununla qəsd etmək və qəsdən qadınlara bənzətmə halı qəsd edilir, beləki bu, iyrənc bir bidətdir. Buna görə də əd-Davudi bunlardan hər ikisinin də qəsd edilməsini mümkün saymışdır.” [“Fəthul-Bari”, 2/578; Daru Taybə, ər-Riyad, birinci nəşr: 1426/2005]

[25] əl-Buxari, (663) ; Allamə İmam İbn Racəb əl-Hənbəli – rahiməhullah – deyir: “Məsrur bin Muhamməd dedi: əl-Əvzai dedi: “Bir qədəri’nin arxasında yalnız zərurət olduqda namaz qılmaq olar”. Bəqiyyətu bin əl-Valid dedi: “əz-Zubeydi’dən soruşdum: “Bidət sahibi və ya qədəri yalanlayan birinin arxasında namaz qılmaq olarmı?” Dedi: “Əgər əmr sahibidirsə, ediləcək bir şey yoxdur, sən üzrlüsən, əgər əmr sahibi deyilsə arxasında namaz qılma!” Digərləri hava və fücur əhli arxasında namaz qılmağı məkruh görüblər. Bəqiyyətu bin əl-Valid deyir: Həbib bin Ömər əl-Ənsari bizə atasından belə dediyini rəvayət etdi: “Vasilə bin əl-Əsqai’ni belə deyərkən eşitdim: “Əgər bir qədəri’nin arxasında namaz qılsam namazımı yenidən qılardım.” Bunu Hərb əl-Kərmani rəvayət etmişdir. Yenə Nuh bin Cəunə’nin vasitəsilə rəvayət edir; Abdul-Kərim bizə rəvayət etdi; dedi: İbn Abbas dedi: “Bir eşşək leşinin arxasında namaz qılmaq mənə bir qədəri’nin arxasında namaz qılmaqdan daha xoşdur.” Bu isnadların hər ikisində də zəiflik var. Əbu Cafər Muhamməd bin Əli’dən rəvayət olunur ki, o, qədərilərin arxasında qılınan namazların təzələnməsini əmr edərdi. Sufyan da belə edərdi. Bir qrup alim isə ağır bidətlər ilə digər bidətlər arasında fərq gözləyirlər.Əbu Ubeyd bir cəhmi və ya bir rafizinin arxasında namaz qılmış biri haqqında dedi ki, “namazını yenidən qılmalıdır.” Kim bir qədərinin, bir mürciənin və ya bir xaricinin arxasında namaz qılarsa namazını yenidən qılmasını əmr etmirəm. Eynilə İmam Əhməd cəhmilərin arxasında qılınan namaz haqqında dedi ki, bu namaz yenidən qılınmalıdır. Ona görə cəhmilər Quranın məxluq olduğunu söyləyənlərdir, belə biri kafirdir, ya da tərəddüd edərək nə məxluq, nə də qeyri-məxluq olduğunu deməyənlərdir. Onun arxasında qılınan namazın yenidən qılınmasını açıq olaraq bildirərək söyləyib: “Quran olaraq tələffüz etdiklərin məxluqdur” deyənlərin – və belələri cəhmidirlər – arxasında namaz qılınmaz, əgər bir qədəri “Allah şeylər baş vermədən əvvəl onları bilməz” deyərsə onun arxasında namaz qılınmaz; beləliklə belə biri kafirdir, əgər arxasında namaz qılınarsa namazını yenidən qılmalıdır. Həmçinin qədərilər haqqında dedi: “Əgər münaqişə edən dəvətçi biridirsə arxasında qılınan namaz təkrar qılınmalıdır.” Onun bu sözləri Allahın qədimdən elmə sahib olduğunu inkar etməyən qədərilərə aiddir. Bir ölkəni ələ keçirmiş xavariclər haqqında dedi: “Arxalarında namaz qılınar.” Bir dəfə isə dedi: “Arxalarında cümə namazı qılınar, çünki İbn Ömər, Nəcdə əl-Haruri’nin arxasında namaz qılıb.” Səhabələri təhqir edən rafizi haqqında

isə dedi: "Belələrinin arxasında namaz qılınmaz." Əlini Əbu Bəkr və Ömərdən üstün tutanlar haqqında dedi: "Elmi olmayan cahil biridirsə, arxasında namaz qılına bilər, ümidvaram ki, belə birində bir problem yoxdur. Lakin bunu özünə din olaraq yaşayan biridirsə, arxasında namaz qılınmaz." Mürciələr – və onlar əməlləri imana daxil etməyən kəslərdir – haqqında dedi: "(Öz bidətinə) dəvət edən biridirsə, arxasında namaz qılınmaz." Hava əhlinin arxasında namaz qılmaq haqqında dedi: "Əgər dəvət edən və ya bidətində münaqişə edən biridirsə, arxasında namaz qılınmaz, əgər belə deyilsə bir problem yoxdur." Bunlar sahibinin təkfir edilmədiyi bidətlərə aiddir, lakin sahibini küfrə salan bidətlərdə isə arxalarında qılınan namaz – İmam Əhməddən daha əvvəl zikr olunduğu kimi – yenidən qılınmalıdır. Harb dedi: "Əhməddən soruşdum: "Bidət əhlinin hamısının arxasında namaz qılmaq məkruhdur?" Dedi: "Onların hamısı eyni deyil." Fasiqlərin arxasında namaz qılmağa gəldikdə isə Əhməd sərxoşluq edən biri haqqında dedi: "Arxasında namaz qılınmaz." İslamın fərzlərindən birini tərk edən və ya riba ilə məşğul olan biri haqqında dedi: "Nə onun arxasında, nə də bütün satışı "inə" satışı olanların, nə də çoxlu yalan danışanların arxasında namaz qılınmaz." İnsanların qeybətini edən birinin arxasında namaz qılmaq haqqında soruşdular və dedi: "Allaha qarşı asi olmuş hər insanın arxasında namaz qılınmasa insanlar necə bu ibadəti (camaat namazını) yerinə yetirəcəklər?" Bir başqa halda isə halı gizli olan ilə aşkar olan arasında fərq gözlədi. Əhməd bin əl-Qasim dedi: "(İnsanların və ya alimlərin) razı olmadığı birinin arxasında namaz qılmaq haqqında Əhməddən soruşdular və dedi: "Onun haqqında alimlər ixtilaf ediblər, əgər öz halını bir münkərdə və ya aşkar əxlaqsızlıqda və ya buna bənzər hallarda göstərmirsə, arxasında namaz qılına bilər." Bir başqa halda isə əmirlər arxsında qılınan namaz ilə başqaları arxasında qılınan namaz arasında fərq qoydu. əl-Məymuni dedi: "Əhmədi belə deyərkən eşitdim: "Əgər imam yerli imamlardandırsa,sərxoşluq edirsə, heç bir zaman arxasında namaz qılmağa razı olmaram, çünki imamları seçməkdə ixtiyar sahibiyəm və o, müsəlmanların əmr sahibi deyildir, çünki İbn Ömər əmirlərin arxasında namaz qılmaq haqqında soruşuldu və dedi: "Namaz gözəl bir əməldir, mənə kimin bunda şərik olmasına önəm vermərəm." Bu mənaya görə hər saleh və facirin arxasında cümə və bayram namazlarında iştirak etmək barəsində ixtilaf edilməmişdir. Ondan məşhur olan görüşə görə facir birinin arxasında olarsa namazı yenidən təkrarlamalıdır. Bidəti onu küfrə götürərsə belə biri ilə (cümədə) iştirak etmək haqqında iki rəvayət var; belə biri ilə iştirak edərsə namazı zöhr olaraq yenidən qılmalıdır. Ondan (ikinci görüş olaraq) rəvayət edilmişdir ki, namazı təkrarlamamalıdır....Lakin bidəti ilə küfr edənlərə gəldikdə isə belələrinin hökmü kafirlərin hökmüdür. Buna görə də İshaq bin Rahaveyh qədərilər və mürciələr arasında fərq qoyardı. Qədərilər haqqında dedi: "Onların arxasında namaz qılınmaz." Mürciələr haqqında isə dedi: "Əgər bidətinə dəvət edənlərdən biridirsə onun arxasında namaz qılınmaz." ["Fəthul-Bari Şərhus-Sahih əl-Buxari", 6/189-193; Məktəbətul-Ğurabə əl-Əsəriyyə, əl-Mədinə, birinci nəşr: 1416/1996] Bu məsələdə hənbəli məzhəbinin görüşü budur ki, cümə və bayram namazları istisna olmaqla digər bütün hallarda facir və mübtədi arxasında namaz qılınmaz. Bu barədə İbn Nəccar əl-Fətuhi – rahiməhullah – deyir: "Fasiqin imamlığı mütləq olaraq səhih deyildir, başqasının arxasında namaz qılmaq mümkün olmadığı üçün cümə və bayram namazları istisnadır. Əgər (arxasında qılmadığı təqdirdə) əziyyətə məruz qalacağından qorxursa arxasında qılar, lakin sonra namazını təkrarlayar. Əgər imam namaz qıldığı zaman hərəkətlərdə ona uyğun hərəkət edərək ya tək başına, ya da bir imam seçərək camaat olaraq namazı qılarlarsa, namazı yenidən qılmağa ehtiyac yoxdur." ["Muntəha əl-İradət", 1/299; Muəssəsətur-Risalə, Beyrut, birinci nəşr: 1419/1999] Buradan anlayırıq ki, hənbəli məzhəbinə görə əgər bir kimsə



bidət əhlinin arxasında namaz qılmağı tərk etdiyi halda ona əziyyət verəcəklərindən qorxarsa, onların arxasında namaz qıla bilər, lakin namazını sonradan təzələməsi lazımdır. Əgər üzdə imamın hərəkətlərinə müvafiq olaraq namaz qılarsa, lakin niyyətində tək başına qılmağı niyyət edərsə, bu namazını təkrarlaması lazım deyildir. Bu dediyimiz hal cümə və bayram namazlarına aid deyildir, çünki cümə və bayram namazlarında çox vaxt müsəlmanın seçimi olmur və bu səbəblə hənbəli alimləri bu kimi vacib namazlarda aşkar fasiqin və dəvət edən mübtədinin arxasında qılınan namazı səhih sayıblar.
Digər tərəfdən hər bir müsəlman hər bidət zənn etdiyi əməl və etiqada görə müsəlmanları tərk etməməlidir. Bu halda bidət olaraq nəzərdə tutulan əməllər və etiqadlar o bidətlərdir ki, onların haqqında üləma ixtilaf etməyib. Lakin haqqında ixtilaf edilmiş bidətlərə gəldikdə isə bunda imamı tərk etmək doğru deyildir. Buna diqqət edin!